"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ QUBA FİLİALI - 30



H.Əliyev
"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"







## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QUBA FİLİALI - 30






ADPU-NUN REKTORU PROFESSOR CƏFƏR CƏFƏROVUN TƏBRİKİ





QUBA RAYON İCRA HAKİMİYYƏTİNİN BAŞÇISI ZİYƏDDİN ƏLİYEVİN TƏBRİKİ





"ŞİMAL BÖLGƏSİNİN YEGANƏ ALİ TƏHSİL OCAĞI" ADPU-NUN QUBA FİLİALININ DİREKTORU DOSENT YUSİF ALIYEV





FİLİALI İRƏLİYƏ APARANLAR KOLLEKTİVİN TƏBRİK MESAJLARI





ADPU QUBA - 30 ŞƏKİLLƏRDƏ






TƏLƏBƏ DÜNYASI



*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Yubiley buraxılışı, 2022 / № 11 (1114)

# ADPU-NUN QUBA FİLİALI - 30 / TƏBRİKLƏR

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN REKTORU PROFESSOR CƏFƏR CƏFƏROV



"Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır", - cənab Prezidentin bu fikirləri son illər sürətli inkişaf yolunda inamla irəliləyən ölkəmizin ən geniş şəbəkələşməyə malik ali təhsil müəssisələrindən olan Pedaqoji Universitet ailəsinin fəaliyyətinə verilən ən ali qiymətdir. Bununla belə, təbii ki, həyat yerində durmur. Dünənki uğurlarımız gələcəyə atılan addımlarımızın möhkəm təməli, bugünkü nəticələrimiz sabahkı yol xəritəmizin kontur cizgiləridir. İndi ərazi bütövlüyünü bərpa etmiş Azərbaycan Respublikası inkişafının yeni mərhələsinə qədəm qoymuşdur. Bu isə bizim də qarşımızda daha məsul vəzifələr irəli sürür. Rəqabətədavamlı insan kapitalının formalaşdırılmasında müasir təhsil-tərbiyə texnologiyasına əsaslanmaqla yeni düşüncəyə, əxlaqi və mənəvi saflığa, yüksək peşə və ixtisas bacarıqlarına malik müəllim kadrlarının hazırlığı, onların vətənpərvər və dövlətçiliyə sədaqət ruhunda tərbiyəsi Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim kollektivinin əsas hədəfidir. Bu sahədə bölgələrimizdə yerləşən ali təhsil ocaqlarımızın – filialların da əməyi danılmazdır. Bu gün bizim hamımızı müqəddəs dəyərlərlə ülvi şəkildə birləşdirən zəngin ənənələrə malik təhsil və elm məbədi - Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi ilə yanaşı, regionda böyük nüfuza malik, özünəməxsus ənənələri olan Pedaqoji Universitetin Quba filialının 30 illik yubileyini qeyd etmək hər birimizdə böyük qürur hissi doğurur. Çoxsaylı kollektivimiz, eləcə də respublikamızın geniş pedaqoji ictimaiyyəti üçün əziz olan bu möhtəşəm yubileylər münasibətilə indiyədək həyat və fəaliyyətini ADPU ilə, Quba filialı ilə bağlamış professor-müəllim heyətini, əməkdaşlarımızı, tələbələrimizi və sədaqətli Vətənimizin müxtəlif guşələrindən, habelə dünyanın uzaq məkanlardan gələn doğma təhsil ocağının hər bir yetirməsini, ölkədəki bütün həmkarlarımızı səmimi qəlbdən bir daha təbrik edirəm!

## QUBA RAYON İCRA HAKİMİYYƏTİNİN BAŞÇISI ZİYƏDDİN ƏLİYEV

Son illər ölkəmizdə həyata keçirilən uğurlu siyasət nəticəsində Azərbaycan həm regionda, həm də dünyada böyük nüfuz qazanmış ölkələr sırasında ilk pillələrə yüksəlmişdir. Təbii ki, burada ilk məqamda 44 günlük Vətən müharibəsində Ali Baş Komandan, möhtərəm Prezidentimiz cənab İlham Əliyevin və yenilməz Azərbaycan ordusunun sayəsində Zəfər qazanmış xalqımızın qüruru dayanır. Xalqımızın bu qüruru dövlətimizin təhsil siyasətinə də öz müsbət təsirini göstərmişdir. Müstəqil dövlətimizin ən mühüm inkişaf göstəricilərindən biri sayılan təhsilimizin inkişafı regionlarda indi daha çox diqqət mərkəzindədir. Son 5 il ərzində təkcə Quba rayonunda dövlətimiz tərəfindən xeyli məktəb binası inşa edilmişdir ki, bu da deyilənlərin bariz nümunəsidir. Bu gün təhsilimizin inkişafında müstəsna xidmətləri olan ADPU-nun Quba filialının yaranmasının 30 ili tamam olur. Sevindirici haldır ki, son illərdə hər 100 min nəfərə düşən ali məktəb tələbələrinin sayına görə Quba rayonu üzrə göstəricilər



əhəmiyyətli dərəcədə artırılmışdır. Əhali təbəqələri və regionlar arasında ali təhsilə çıxış imkanları genişləndirilmişdir. Belə ki, statistik məlumatlar əsasında deyə bilərəm ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında son 5 ildə ixtisas sayı 5-dən 10-a, tələbə sayı isə 700 nəfərdən 980 nəfərə yüksəlmişdir. Buna görə də ADPU-nun Quba filialı həm regionumuzda, həm də ölkəmizdə elm, təhsil, mədəniyyət mərkəzi kimi tanınır. Bu ali təhsil müəssisəsi bilavasitə gələcəyə hədəflənir, öz yetirmələrini innovativ münasibətlərə yiyələnməyə motivasiya etməyə çalışır. Bu da 170 min nəfərdən çox əhalisi olan Quba rayonunun gələcək inkişafı üçün yeni perspektivlər açır.

ADPU-nun Quba filialının yaranmasının 30 illik yubileyi münasibətilə bütün kollektivi, təhsil işçilərini, müəllimləri, tələbələri və filialın məzunları olmaqla təhsilimizin inkişafında yorulmadan fəaliyyət göstərən Azərbaycan övladlarını Quba rayon İcra Hakimiyyətinin kollektivi, rayonumuzun bütün ictimaiyyəti və şəxsən öz adımdan ürəkdən təbrik edir, hər birinizə möhkəm cansağlığı və müvəffəqiyyətlər arzulayıram.

# ŞİMAL BÖLGƏSİNİN YEGANƏ ALİ TƏHSİL OCAĞI

## ADPU-NUN QUBA FİLİALININ DİREKTORU DOSENT YUSİF ALIYEV



Şimal bölgəsində pedaqoji kadr hazırlığı məqsədilə 1943-cü ildə yaradılan Quba Dövlət Müəllimlər İstitutunun varisi hesab olunan filial Azərbaycan Respublikası Nazirlər Kabinetinin 25 mart 1991-ci il tarixli 70 nömrəli qərarı ilə Azərbaycan Dövlət İncəsənət Universitetinin Quba filialı kimi yaradılmışdır. Ali təhsil müəssisəsi kimi fəaliyyətə başlayan Quba filialı özündə dörd ixtisası - "Mədəni maarif işi", "Dekorativ tətbiqi sənət", "Şüşə-keramika", "Aktyorluq" ixtisaslarını birləşdirmişdir.

Azərbaycan Respublikasının Prezidentinin 13 iyun 2000-ci il tarixli 349 saylı fərmanı ilə Azərbaycan Müəllimlər İnstitutu yaradıldıqdan sonra Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin Quba filialının bazasında AMİ-nin Quba filialı yaradıldı.

Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin Quba filialının bazasında Azərbaycan Müəllimlər İnstitutunun Quba filialının açılmasını zəruri edən bir sıra səbəblər vardır. Təhsil siyasətinin tələbləri əsasında Şimal bölgəsində yaşayan etnik xalqlara diqqət və qayğının artırılması məqsədilə məktəbəqədər təhsil müəssisələri və orta məktəblərin ibtidai sinifləri üçün ehtiyac duyulan pedaqoji kadrların hazırlanması vacib hesab edilmişdi.

AMİ-nin Quba filialı Azərbaycan Respublikasının Prezidentinin 26 noyabr 2015-ci il tarixli 1582 nömrəli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulmasından sonra ADPU-nun Quba filialı kimi fəaliyyət göstərir. Onu da qeyd edək ki, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (indiki ADMİU) Quba filialı Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 25 Mart 1991-ci il tarixli qərarı ilə təsdiq edilmişdir.

ARDI 3-CÜ SƏHİFƏDƏ

**Filialın tarixi:**

Filial 2,5 ha ərazidə 2 və 3 mərtəbəli 2 binada yerləşir. Fəaliyyətinin ilk dövrlərində filiala "İbtidai təhsilin pedaqogikası və metodikası" və "Məktəbəqədər təhsilin pedaqogikası və metodikası" olmaqla yalnız 2 ixtisas üzrə qəbul planı təsdiq edilmiş, 2007-ci il də isə "Azərbaycan dili və ədəbiyyatı", "Tarix və coğrafiya" ixtisasları olmaqla əlavə 2 ixtisas üzrə də qəbul həyata keçirilmişdir. 2011-ci ildə "Təhsildə sosial-psixoloji xidmət", 2013-cü ildə "Riyaziyyat və informatika müəllimliyi və həmin ildə yenidən bərpa edilmiş "Məktəbəqədər təlim və tərbiyə" ixtisasları hesabına sayı 6-a çatdırılmışdır. 2020/2021-ci tədris ilində filialda yeni "Sosial iş", "Riyaziyyat müəllimliyi", "Tarix müəllimliyi", "Coğrafiya müəllimliyi" ixtisasları da açılmışdır. Cari tədris ilində filial üçün yeni ixtisasların açılması da gözlənilir.

Son 3 ildə Filialın ixtisaslarına müsabiqə xeyli yüksəlmiş, keçid ballarında dinamik artım özünü göstərmişdir.

Quba filialı bölgədə mədəni həyatın inişafında müstəsna əhəmiyyəti olan ali təhsil ocağıdır. Hazırda filialda direktor, 2 direktor müavini və direktor köməkçisi, 9 struktur, 1 fakültə və 3 kafedra fəaliyyət göstərir.

Filialın yardıldığı ildə, yəni 1991/1992-ci tədris ilində filiala 4 ixtisas üzrə respublikanın 31 şəhər və rayonundan 124 nəfər tələbə qəbul olunmuşdur. Hazırda filialda 10 ixtisas üzrə 945 nəfər tələbə təhsil alırki, bu sahədə də yüksəliş göz qabağındadır.



1991-ci ildə Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin Quba filialı kimi fəaliyyətə başlayan filialımızda tədris prosesini həyata keçirmək üçün bölgədə yaşayan 6 nəfər alim, habelə tanınmış, yüksək hazırlıqlı digər mütəxəssislər cəlb olunmuşlar. Bəzi elm sahələri üzrə ixtisaslı mütəxəssislərin azlığına görə Bakıdakı ali təhsil müəssisələrindən, xüsusən Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetindən və AMEA-danda alimlər dəvət edilmişdir. Keçən illər ərzində bu sahədə də həm kəmiyyət, həm də keyfiyyət baxımından uğurlar əldə edilmişdi. Hazırda təhsil ocağımızda 83 nəfər professor-müəllim heyəti çalışır ki, onlardan da 6 nəfəri elmlər doktoru (o cümlədən 1 nəfəri professor), 21 nəfəri fəlsəfə doktoru, (o cümlədən 13 nəfəri dosent), 22 nəfər baş müəllim, 35 müəllim tədris və elim fəaliyyətlə məşğul olurlar. Müəllimlərimiz arasında 4 nəfər magistr, 17 nəfər doktorant və dissertantdır. Son 5 ildə filial əməkdaşlarından 1 nəfəri elmlər doktoru proqramı üzrə, 4 nəfəri fəlsəfə doktoru proqramı üzrə dissertasiyamüdafiə edərək alimlik dərəcələri almışlar. Onu da qeyd edək ki, yeni fəlsəfə doktoru alan 4gənc alim məhz filialımızın yetirmələridir.

**Müasirləşən filial:**

ADPU-nun Quba filialında professor-müəllim heyətinin elmi-tədqiqat işlərinə cəlb edilməsi sahəsində xeyli uğurlu nəticələr əldə edilmişdir. 2020/2021-cı ildə filial əməkdaşları tərəfindən tədris prosesi üçün zəruri duyulan dərslik, proqram, elmi və elmi metodiki məqalələr, konfrans tezisləri hazırlanaraq nəşr etdirilmişdir.

Filialın professor-müəllim heyəti, gənc tədqiqatçıları və tələbələri respublika və beynəlxalq səviyyəli elmi konfranslarda, müxtəlif layihələrdə müntəzəm iştirak edirlər. Quba filialından məzun olan gənc mütəxəssislərin xoş soraqları bugün müxtəlif məktəblərdən, maarif şöbələrindən, təhsil ocaqlarından gəlir. İlk gündən filialda mövcud situasiyanı düzgün qiymətləndirərək əməkdaşlar və tələbələr arasında sağlam əməkdaşlıq gücləndirməsi, nizam-intizamın möhkəmləndirilməsinin təmin edilməsi nəticəsində yeni şöbələr yaradılmışdır, Keyfiyyətin təminatı şöbəsi, Kitabxana və elektron resusrlar şöbəsi, İnsan resusrları və kargüzarlıq şöbəsi və igər bütün şöbələrdə iş bölgüsündə bacarıqlar, səriştəlilik nəzərə alınmışdır. Həmçinin yeni Akt zalı, Heydər Əliyev lektoriyası, İnkluziv təhsil laboratoriyası yaradılmış, müasir avadanlıqlarla təchiz edilmişdir. Filialın rəhbərliyinin təşəbbüsü ilə AMEA-nın Mərkəzi Elmi Kitabxanası və "Qafqaz" TV ilə əməkdaşlıq memorandumlarının imzalanması, filialın kitabxana fondunun zənginləşdirilməsi, filialda yenidənqurma, təmir və bərpa işlərinin aparılması, fiberoptik intetnet şəbəkəsinin gücləndirilməsi, yeni tipli 20 ədəd kompüterdən ibarət Kompyuter-informasiya auditoriyasının istifadəyə verilməsi, əməkdaşların sosial vəziyyətlərinin yaxşılaşdırılması yönümdə atılan addımlar, tələbələrin elmə marağının gücləndirilməsi maqsədi ilə ulu öndər Heydər Əliyevin hakimiyyətə gəlməsinin 50-ci ildönümündə Fənn Olimpiadasının keçirilməsi, filialda Elmi Şuranın qərarı ilə tələbələr üçün "Adlı təqaüd"lərin - Ümummilli lider Heydər Əliyev adına ali təqaüd, müvafiq ixtisaslar üzrə Fətəli xan adına, Abbasqulu ağa Bakıxanov adına, Səməd Vurğun adına, Nadir İbrahimov adına, Kübra Fərəcova adına, Badisəba xanım Köçərli adına təqaüdlərin təsis edilməsi, milli vətənpərvərlik ruhunda tərbiyəvi tədbirlərin keçirilməsi, istərsə də maddi-texniki bazanın yaxşılaşdırılması, yeni tipli auditoriyaların, müasir standartlara uyğun tələbə yeməkxanasının istifadəyə verilməsi, 20160 nüsxə kitab fondu olan filial kitabxanasında həmçinin kompyuterlərin genişzolaqlı fiberoptik internet xəttinə qoşulması, 154 adda 600 nüsxəyə yaxın dərslik, dərs vəsaitləri və xarici ədəbiyyatların alınaraq kitabxana fondunun zənginləşdirilməsi, digər sosial tipli layihələrin icrasına başlanılması həmçinin müxtəlif universitetlərlə əməkdaşlı layihələrin icrası 30 illik yubiley ərəfəsində nüfuzlu müxtəlif təbrik məktublarının medalların filiala ünvanlanmasına səbəb olmuşdur. Filialda "Tədqiqat universiteti" statusuna hədəflənmişelmi-tədqiqat fəaliyyətinin sistemləşdirilməsi və nəzarətə götürülməsi məqsədilə Gənc alimlər və tədqiqatçılar şurası yaradılmış, doktorant və dissertantların elmi fəaliyyətinin izlənilməsi və vahid mərkəzdən idarə edilməsi diqqətdə saxlanmışdır.



Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialının təşəbbüsü və təşkilatçılığı, ADPU-nun rektoru professor Cəfər Cəfərovun dəstəyi ilə dünyanın 6 ölkəsinin 11 universiteti bir ortamda araya gələrək filial tarixində möhtəşəm ilkə imza atıldı. Belə ki, may ayının 14-də ADPU-nun Quba filialı dünyanın əksər ölkələrində ali təhsilin onlayn formada həyata keçirilməsini nəzərə alaraq bu sahədə qarşılıqlı təcrübələrin öyrənilməsinə böyük ehtiyac olduğundan ulu öndər Heydər Əliyevin anadan olmasının 97-ci ildönümünə həsr olunmuş "Pandemiya şəraitində onlayn təhsil: reallıqlar və perspektivlər" mövzusunda beynəlxalq onlayn seminara ev sahibliyi etdi. "Zoom" platforması üzərindən təşkil edilən Beynəlxalq onlayn seminarda Almaniyanın Rostok Universitetinin, Türkiyənin Ankara Universiteti və Qazi Universitetinin, Amerikanın San Diego Dövlət Universitetinin Gürcüstan bölümünün, Qırğızıstanın Qırğızıstan Təhsil Akademiyasının, Şimali Kipr Türk Cümhuriyyətinin, Girne Amerikan Üniversitetinin, Azərbaycan Dövlət Pedaqoji Universitetinin, Azərbaycan Texniki Universitetinin təhsil sahəsində tanınmış məruzəçilərin və Naxçıvan Müəllimlər İnstitutunun, Bakı Dövlət Universitetinin Qazax filialının, ADPU-nun filiallarının nümayəndələri iştirak etdi. ADPU-nun Quba filialının Doktorant və Gənc Tədqiqatçılar Şurasının (DGTŞ) təşkilatçılığı ilə 28 May - Respublika Gününə həsr olunmuş "28 May - Azərbaycanın istiqlaliyyət imzası" adlı onlayn elmi konfrans keçirməklə daha bir ilk uğura imza atmağı bacardı.15 İyun - Milli Qurtuluş Günü ilə əlaqədar keçirilən "Qayıdışdan qurtuluşa" adlı onlayn elmi-praktik konfrans da respublika səviyyəli idi. Konfrans filial tarixində ilk dəfə olaraq Quba Rayon İcra Hakimiyyəti nümayəndələrinin, respublikanın tanınmış alim və ziyalılarının, siyasətçilərinin, Quba rayonunun ictimai-siyasi həyatında önəmli yer tutan struktur rəhbərlərinin də iştirakı ilə geniş tərkibdə keçirilib.

**Tələbələrlə iş:**

Bütün bu görülən işlərin isə yalnız bir məqsədi var idi, filialın ümumi inkişafı, gənclərin dövlət, cəmiyyət üçün yararlı kadr kimi yetişdirilməsi, onların dünyagörüşünün formalaşdırılması. Və nəticə də əldə edildi. Belə ki, məzun olan tələbələrimiz sırasından magistratura imtahanlarında uğurlu nəticələr göstərərək, filial tarixində ilk dəfə olaraq filialın 23 tələbəsinin magistratura imtahanlarında uğur əldə edərək müxtəlif universitetlərə qəbul oldu.




Filialda tələbələrin asudə vaxtlarının səmərəli təşkili məqsədi ilə müntəzəm Olaraq müxtəlif mövzularda elmi konfranslar, disput və debatlar, yubiley və müsabiqələr, yarışlar keçirilir, müxtəlif kurslar təşkil olunur. Filialda tələbə gənclərin fəallığının təmin edilməsi məqsədi ilə yaradılan klubların fəaliyyəti də gündən-günə artmaqdadır.

Bundan əlavə filialda fəaliyyət göstərən fəal tələbə təşkilatlarının TGT, THİK və TEC-nin arasında əməkdaşlığın nizama salınması məqsədi ilə yaradılan Tələbə Koordinasiya Şurasının, akademik Azad Nəbiyev adına "Bilgə ocağı"nın yaradılması, tələbələrin yaşadıqları evlərdə və yataqxanada onlarla ziyarətlərin təşkili, tələbələrin, digər sosial tipli layihələrin icrasına başlanılması bir daha onu deməyə əsas verir ki, filial rəhbərliyin səyi və kollektivin birliyi ilə yeni mərhələyə artıq ilk və uğurlu addımlarını atmışdır.

Filialın tələbələri respublika və beynəlxalq konfranslarda Azərbaycan və ingilis dillərində məruzələr etdilər.

**Beynəlxalq əməkdaşlıq:**

Təhsildə beynəlxalq əməkdaşlıq respublikamızda həm orta təhsilin, həm də ali təhsilin keyfiyyətini artırmaqla yanaşı, dövlət və özəl idarələrin də savadlı və bacarıqlı kadrlarla təmin edilməsinə şərait yaradır.

Professor Cəfər Cəfərovun rəhbərliyi altında Azərbaycan Dövlət Pedaqoji Universitetinin bu sahədə, yəni təhsilin beynəlmiləşdirilməsi istiqamətində əldə etdiyi uğurlar artıq filiallara da stimul və örnək bəxş edir. Sizin rəhbərliyinizlə Universitetin beynəlxalq əlaqələr sahəsində həyata keçirilən məqsədyönlü işlər həm ADPU, həm də onun filialları qarşısında daha şəxəli və məqsədli hədəflər müəyyən edir. Təhsildə Keyfiyyət Təminatı Agentliyi tərəfindən 2018/2019-cu tədris ilində ADPU-nun Quba filialında akkreditasiya həyata keçirilmişdir və akretidasiyanın tələblərinə görə filialda strateji inkişafın təmin edilməsi, elmi-tədqiqat işlərinin sistemli şəkildə həyata keçirilməsini təşkil etmək, həmçinin filialın beynəlxalq əlaqələrinin yüksək səviyyədə təşkil edilməsi üçün müvafiq strukturların yaradılması tövsiyələr sırasında göstərilmişdir.



Onlardan biri də filialda Beynəlxalq əməkdaşlığın gücləndirilməsi isitiqamətində fəaliyyət göstərəcək mütəxəssislərin işə cəlb edilməsi və filialın da Beynəlxalq layihələrdə iştirak (Erasmus+, Mevlana və s.) etməsinin təmin edilməsidir. Belə ki, hazırda ADPU-nun Quba filialı bir sıra beynəlxalq universitetlərlə elmi əməkdaşlığa qoşulub, şəxsi yönümdə nüfuzlu elmi-tədqiqat mərkəzləri ilə elmi əlaqələr yaradıb və səmərəli əməkdaşlıq edir. Azərbaycanın təhsil

ARDI 4-CÜ SƏHİFƏDƏ

müəssisələri daxil olmaqla, filialın alimləri Avropada nüfuzlu beynəlxalq təşkilatların təhsil və elmi problemlərlə məşğul olan qurumlarının işində fəal iştirak edir. Belə ki, filial Polşanın Poznan Universiteti, Almaniyanın Rostok Universiteti, Türkiyənin Ankara Universiteti və Qazi Universiteti, Amerikanın San Diego Dövlət Universitetinin Gürcüstan bölümü, Qırğızıstanın Qırğızıstan Təhsil Akademiyası, Şimali Kıpr Türk Cümhuriyyətinin Girne Amerikan Üniversiteti, Moldovanın Tiraspol Universitet və digər ali təhsil müəssisələri ilə elmi əməkdaşlıq edir. Bundan başqa filialın alimləri, müəllimləri, gənc doktorant və dissertantları, tələbələri də müxtəlif ölkələrin nüfuzlu elmi və dövrü jurnallarında məqalələr çap etdirir, konfranslarda iştirak edirlər.

Beynəlxalq əməkdaşlıq nəticəsində ADPU-nun Quba filialının 30 illik yubileyi ilə əlaqədar Tiraspol Dövlət Universiteti Senatının qərarı ilə "Tiraspol Dövlət Universiteti" qızıl medalı ilə təltif olunub, Qırğızıstan Təhsil Akademiyası yubiley təbriki ünvanlayıb.

Təbii ki, bütün bu qeyd etdiklərimiz filialda görülən işlərin bir qismidir. Bu görülən işlərin və hörmətli rektorumuz professor Cəfər Cəfərovun etimadının nəticəsidir ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi münasibətilə və pedaqoji kadrların hazırlığı sahəsində səmərəli elmi-pedaqoji fəaliyyətinə görə Azərbaycan Respublikasının Təhsil naziri Emin Əmrullayevin əmri ilə ADPU-nun Quba filialının direktoru dosent Yusif Alıyev, tədris və elmi işlər üzrə direktor müavini t.f.d.İsmayıl Mahmudov, sosial humanitar məsələlər üzrə direktor müavini Aysel Şeydayeva "Azərbaycan Respublikası qabaqcıl təhsil işçisi" döş nişanı, filialın Ədəbiyyat və dillər kafedrasının müdiri dos. Gülşən Ağabəy və Pedaqoji və ictimai fənlər kafedrasının müdiri t.ü.f.d. Elnur Nəsirov "Fəxri fərman"la təltif ediliblər.

Ümumilikdə gördüyümüz bu işlərlə aşağıdakıları təqdim etməyə çalışırıq:

- Tədris, təlim və tərbiyə prosesinin müasir tələblərə uyğun qurulması
- Keyfiyyətli təhsil
- Yüksək tədris göstəricilərinə sahib gənclərə yaradılan güzəştlər
- Gənclərin asudə vaxtının səmərəli təşkili üçün klub və dərnəklərin fəaliyyəti
- Gənclərin elmi və şəxsi inkişafına dəstək layihələri
- Tələbə nailiyyətlərinin obyektiv qiymətləndirilməsi
- Müəllim - tələbə əməkdaşlığı
- Təhsil-tərbiyə prosesinin təşkilində peşəkarlıq
- Müəllim və tələbələrə humanist münasibət

ADPU-nun Quba filialının kollektivi əldə olunan uğurları filial üçün əsaslı nailiyyətlər hesab etsə də, ən böyük uğurların qarşıda olduğu düşüncəsi ilə yorulmadan, əzmlə çalışır. Bölgə ali məktəbi üçün qaneedici elmi-pedaqoji kadr potensialı formalaşdıran filial gələcəkdə müstəqil Azərbaycanın uğurlu inkişafı fonunda mövcud bazasında kadr hazırlığı sahəsində sərbəst universitet statusuna malik ali məktəb formalaşdırmağı qarşısına hədəf qoyub.

# FİLİALI İRƏLİYƏ APARANLAR



Şimal-şərq regionunun yeganə ali təhsil müəssisəsi olan ADPU-nun Quba filialının şərəfli təhsil tarixinin 30 illik yubileyidir. Keçən bu illərdə filialımız ölkəmizdə 3000-dən çox gəncin təhsil almasında, savadlı müəllim kadrlarının hazırlanmasında və onların dövlətə, dövlətçiliyə layiqli vətəndaş kimi yetişməsində əvəzsiz rol oynamışdır. Cəmiyyətin sürətli inkişafı ilə daim ayaqlaşmaqla, yeni innovativ tədris fəaliyyəti həyata keçirməklə yanaşı Quba filialı milli təhsil siyasətinin özünəməxsus ənənələrini daim qorumuş və inkişaf etdirmişdir. Yubiley münasibətilə bütün ADPU ailəsini, filial rəhbərliyini, professor müəllim heyətini, əməkdaşları təbrik edir, təhsil və elm sahəsində hər birinə uğurlar arzu edirəm. İnanırıq ki, ADPU-nun Quba filialı illərdir təhsil və elm sahəsində qoruyub saxladığı təmiz və ülvi dəyərlərinə daim sadiq qalacaq. 30 yaşın mübarək, doğma filialım!

**Direktor köməkçisi b/m. M.C.Əliyev**



Quba şəhərində bu gün fəaliyyət göstərən, keyfiyyətli pedaqoji kadrların hazırlanmasına görə artıq respublikada sözünü deyə bilən ADPU-nun Quba filialının struktur bölmələri, eyni zamanda, Tədris şöbəsi öz fəaliyyətini günün tələbləri səviyyəsində quraraq ADPU-nun müvafiq strukturları - Tədris departamenti, müvafiq dekanlıq və kafedraları, Təhsil Nazirliyinin qurumları, AMEA-nın aidiyyəti institutları ilə müntəzəm əlaqə saxlayır və təhsil tariximizdə öndə gedən müəssisələrin uzunmüddətli təcrübələrindən yararlanır. 30 illik tarixini arxada qoyan Filialda müxtəlif ixtisaslar üzrə tələbə sayının, akademik qrupların, elmi potensialın artması, müasir dövrün tələb və trendlərinin dəyişilməsi şöbənin hər bir əməkdaşından tələb edir ki, işlərini müasir dövrün tələblərinə uyğun səviyyədə qursunlar.

Biz də, şöbənin bütün kollektivi olaraq, ADPU-nun Quba filialının 30 illik tarixi ilə qürur duyur, yeni nailiyyətlərin davamlı olmasını arzu edirik. İnanırıq ki,filialda bundan sonra datədris işinin qurulmasında humanist prinsiplərə, sağlam rəqabətə, yüksək yoldaşlıq münasibətlərinə, milli-mənəvi dəyərlərimizə maksimun dərəcədə əməl olunacaqdır. ADPU-nun Quba filialının 30 yaşının tamam olması münasibətilə bütün kollektivimizi ürəkdən təbrik edirəm.

**Tədris şöbəsinin müdiri**
**B/m. M.T.Bağırova**



30 illik tarixə malik olan Quba filialında görülən hər bir uğurlu fəaliyyət, beynəlxalq miqyaslı layihələr əslində onun bünövrəsinin güclü bir özülə sahib olmasında irəli gəlir. Yarandığı gündən etibarən ADPU-nun Quba filialının Pedaqoji fakültəsinin dekanlığıöz kollektivi daxilində sağlam psixoloji mühit yaratmaqla uğurlu təlim prosesini qurmuş, vəzifələrini layiqincə yerinə yetirməyə və daha böyük uğurlara nail olmaq üçün əzmlə çalışmışdır. Tədrisin keyfiyyətinin yüksəldilməsi, öyrənənlərin təhsilə motivasiyasının güclənməsini təmin etmək məqsədi ilə pedaqoji fakültədə fənlər üzrə olimpiadalar keçirilir, adlı təqaüdlər, fərqlənən tələbələr üçün mükafatlar, fəxri fərmanlar təsis edilir. Pedaqoji fakültə filialın rəqabətə davamlılığının təmin olunması məqsədilə daim təhsilin keyfiyyətinin və səmərəliliyinin yüksəldilməsinə xidmət edən tədbirlərin həyata keçirilməsini təmin edir. Əmək bazarının tələblərinə uyğun olaraq yeni ixtisaslar üzrə kadr hazırlığının təmin olunmasını, beynəlxalq əlaqələr sahəsində fəaliyyətini genişləndirməsini, qabaqcıl beynəlxalq təhsil layihələrində iştirakını, elektron təhsil sisteminin qurulmasını davam etdirərək filialın uğurlarına yeni-yeni töhfələr verməyi qarşısına məqsəd qoyur.

Filialımızın bugünkü nailiyyətlərinin əsasında məhz Pedaqoji fakültənin də 30 illik zəhməti və fədakar əməyi dayanır desək qətiyyən yanılmarıq. Quba filialının nəinki Respublikamızda, hətta ölkəmizin hüdudlarından kənarda belə elm və təhsil ocağı kimi tanınmasında əvəzolunmaz rolu olan, ən çətin və mürəkkəb dövrlərdə həyatını filialın güclənməsinə həsr edən, filialın uğurlarını təmin edən direktor dosent Yusif Alıyevə dərin minnətdarlığımızı bildirir, onu və bütünlükdə filialının kollektivini yubiley münasibəti ilə təbrik edirik! Qoy qeyd etdiyimiz 30 illik yubiley bu gün - daha böyük uğurların yeni bir başlanğıcı olsun...

**Pedaqoji fakültənin dekanı**
**f.f.d. Q.S.İdrisov**



30 ildir ki, müxtəlif universitetlərin filialı olaraq Quba filialı fəaliyyət göstərməkdədir. Mənim bu filialda əməkdaşlığım isə Azərbaycan dili və ədəbiyyat müəllimi ixtisası ilə bağlıdır. 2007-ci ildə AMİ Quba filialı dövründə bu ixtisas yaradılmışdır. 13 ildir ki, mən Azərbaycan və ədəbiyyat müəllimi ixtisasında Azərbaycan və dünya ədəbiyyatı fənlərini sevə-sevə tədris edirəm. Eyni zamanda Ədəbiyyat və dillər kafedrasının müdiri vəzifəsində çalışıram.

Kafedramızda respublikamızın tanınmış alimləri, rayonumuzun təcrübəli pedaqoqları və filialımızın məzunları çalışırlar. Kafedramızın professor- müəllim heyəti Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasının tələbələrinə öz biliklərini yüksək səviyyədə tədris edir, İKT tətbiq olunmuş dərslər təqdim edir, dövrün tələblərinə uyğun kadrların yetişməsinə səy göstərirlər. Bu ixtisasda təhsil alan tələbələr doğma ana dilimizi və ədəbiyyatımızı dərindən sevən və gələcəkdə öyrəndiklərini tətbiq edə biləcək gənclərdir.

Bu ixtisasın ilk buraxılış ili 2011-ci il olmuşdur. Həmin ildən bəri 200-dən çox məzunumuz filialın diplomunu alaraq müxtəlif sahələrdə əmək fəaliyyətinə başlamışlar. Məzunlarımızın bir qismi müxtəlif ali məktəblərin magistartura ixtisaslarında təhsil alır, bir qismi filialımızda müəllim, laborant, tyutor vəzifəsində, əsasən orta məktəblərdə müəllim, bir qismi də digər sahələrdə yüksək vəzifələrdə çalışırlar. Mən həm kafedramızın müəllimləri, həm də tələbə və məzunlarımızla fəxr edir, qürur duyuram. Yubiley münasibətilə kollektivimizin bütün üzvlərini və məzunlarımızı ürəkdən təbrik edirəm.

**Ədəbiyyat və dillər kafedrasının müdiri**
**dosent G.Ş.Ağabəy**



Fəaliyyətinin 30 illiyini qeyd edən ADPU-nun Quba filialı ölkəmizin təhsil həyatında özünə layiqli yer tutmuş, qürurverici və şərəfli bir tarixi inkişaf yolu keçmişdir. Çalışdığım bu ali təhsil ocağının yubileyini təbrik etmək mənə həqiqətən böyük qürur hissi verir. Filialımız fəaliyyət göstərdiyi 30 il ərzində Azərbaycan təhsilinin formalaşdırılması və inkişafı üçün öz üzərinə düşən işi fəxarətlə yerinə yetirmiş, peşəkar milli kadrlar, pedaqoqlar yetişdirmişdir. Kollektivimiz bu gün də üzərinə düşən vəzifələri əzmkarlıq və peşəkarlıqla yerinə yetirməkdədir. Bu səbəbdən də ADPU-nun Quba filialı gündən günə güclənərək, ölkəmizin ali təhsil sistemində önəmli bir elm, təhsil ocağına çevrilməkdədir. Bu təntənəli gün münasibətilə ADPU-nun Quba filialının rəhbərliyini, professor-müəllim heyətini, eləcə də dəyərli tələbələrimizi təbrik edirəm. Kollektivimizin üzvlərinə bu şərəfli elm və təhsil yolunda nəzərdə tutduqları bütün arzu, istək və planlarını həyata keçirmələri üçün tükənməz əzm, yaradıcılıq ruhu, tərəqqi arzulayıram.

**Pedaqoji və ictimai fənlər kafedrasının müdiri t.f.d. E.G.Nəsirov**



Hazırda ADPU-nun Quba filialında tarixi ənənələrin və modern dünya təcrübəsinin vəhdəti şəklində tədris müasir, innovativ təlim texnologiyaları əsasında qurulur, kafedralarda elmi-tədqiqat işlərinin məzmunu günün tələblərinə uyğun şəkildə yenilənir, kollektivin, filialın struktur bölmələrinin ölkədaxili əməkdaşlığı inkişaf etdirilir.

Filialda hər zaman tələbələrin yüksək səviyyədə təhsil almaları, elmi-tədqiqat işlərinə cəlb olunmaları üçün dərslər ən müxtəlif innovativ üsul və metodlar tətbiq etməyi bacaran professor və müəllim heyətinə etibar edilir. Bu baxımdan kafedralarda da görülən işlər göz qarşısındadır. Bizlər də çalışırıq ki, filialın inkişafı üçün, elmi kadr balansının toplanması üçün əlimizdən gələni edək. Bu baxımdan 30 ilin təcrübəsində bizlərin də rolu vardır və yubileyimiz münasibətilə kollektivi təbrik edir, yeni hədəflərə doğru uğurlu yol arzu edirəm.

**Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının müdiri dosent G.Ə.Həmzəyev**



Quba filialı da digər ali və orta təhsil ocaqları kimi təməl daşlarını kitabxana üzərində qoyub. Kitabxanamızda ildən ilə artan kitab sayı dinamikası tələbə dinamikası ilə düz mütənasib şəkildə irəliləyir. Bu gün istər filialda təhsilalanların, istərsə də təhsilverənlərin ilk diqqət mərkəzində və suallarında kitabxana fondu dayanır. Bu səbəbdən də filial rəhbərliyi strateji inkişafa uyğun olaraq kitabxana fondunun elektron və ənənəvi qayda ilə zənginləşdirilməsində maraqlıdır. Filial kitabxanasının fondunda hazırda 20993 nüsxə kitab vardır ki, olnardan da bədii ədəbiyyat – 6973, dərslik və dərs vəsaiti – 9841, xarici ədəbiyyat – 2004, jurnal və broşüralar – 2175 saydadır. Həmçinin vəsaitlərin də elektron variantlarının hazırlanması üzərində iş gedir. Bundan əlavə kitabxanaya filialımızın abunə olduğu qəzet və jurnallar da daxil olur. Bunlarla bərabər 2019-cu il 27 noyabrda Azərbaycan Milli Elmlər Akademiyasının Mərkəzi Elmi Kitabxanası və ADPU-nun Quba Filialı arasında əməkdaşlıq haqqında Memorandum imzalanmışdır. Bu isə yeni vəsaitlərin əldə edilməsi deməkdir.Ümumilikdə Kitabxana və elektron resurslar şöbəsi filialın əhəmiyyətli strukturlarından biri olaraq, hazırda şöbənin yeni avadanlıqlarla təmin edilməsi, elektron kitab və dərslik bazasının bütövləşdirilməsi, əlçatanlığı istiqamətində sistemli iş aparır. Filialın direktoru dos. Y.Alıyevin rəhbərliyi ilə yeni kitabxana fondunun və müxtəlif guşələrin yaradılması da diqqət mərkəzindədir. Sevindirici haldır ki, biz də bu etimada layiq olmaq məqsədi ilə məsuliyyətimizi dərk etmiş bu günə qədər qarşımızda qoyulan iş rejimində ürəklə çalışmış, kitabxananın ənənəvi formada deyil, həm də onlayn əlçatanlığını təmin etməklə "Müasir Kitabxanaya Xoş Gəldin!" devizini rəhbər tutmuş, işimizə dəyər verməyi bacarmışıq.

**Kitabxana və elektron resurslar şöbəsinin müdiri S.F.Hacıyeva**



Hər bir müəssisə və təşkilatın fəaliyyətinin əsas hissəsi mühasibatlıq sənədlərinin əsasında təşkkül tapır. Əbəs yerə mühasibatlığı təşkilatın güzgüsü adlandırmırlar. ADPU-nun Quba filialının Maliyyə şöbəsi də peşəkar və çevik komanda ilə hər zaman işini yüksək səviyyədə təşkil etmişdir. İşçilərin maddi rifah halının yaxşılaşdırılması daim rəhbərliyin diqqət mərkəzində olduğundan bizlər də komanda şəklində filialın inkişafı üçün əlimizdən gələni edirik. Bütün bu illər ərzində isə filialda çəkilən zəhmətdə bizim də payımız vardır. Bu səbəbdən bu tədbir bizim də bayramımızdır. Bizlər də, direktor dosent Yusif Alıyev başda olmaqla, bütün filial kollektivini 30 illik möhtəşəm yubiley münasibətilə səmimi qəlbdən təbrik edir, yeni nailiyyətlər arzu edirik!

**Mühasibatlıq şöbəsinin müdiri M.İ.Malıyeva**



Doğma Qubamızda yerləşən yeganə ali təhsil müəssisəsi olan filialımız son illər özünün ən parlaq inkişaf dövrünü yaşayır. Yaşı müstəqilliyimizin bərpası ilə eyni olan filial 30 illik tarixi boyunca minlərlə məzuna ziya, nur, savad verərək bu gün təntənəli şəkildə, üzü ağ formada öz yubileyini qeyd edir. Bu münasibətlə Quba filialının dəyərli kollektivini 30 illik yubiley münasibətilə təbrik edirəm. 30 illik tarixin 19 ili mənim də həyatıma unudulmaz və mükəmməl izlərini həkk etmişdir. Quba filialının auditoriyalarında hər zaman böyük qürur və sevinc hissi ilə xatırladığım müəllimlərimdən bilik, bacarıq, savad öyrənərək onların müqəddəs yolunu öz yolum bilmişəm. Şərəfli və məsuliyyətli müəllimlik peşəsinə bu universitetdə yiyələnmişəm. Hazırda da bu universitetin müəllimi, doktorantı və əməkdaşıyam. Ötən 30 il ərzində filialda tədris, təhsil və elmi fəaliyyət yüksək səviyyətə təşkil edilərək bölgədə yüksək ixtisaslı müəllim kadrların yetişdirilməsi işi həyata keçirilmişdir. Bununla da Quba filialı regionun təhsil, ictimai-sosial və mədəni həyatında kifayət qədər fəal iştirakı ilə əvəzsiz xidmətlər göstərərək təhsil siyasətimizin yerinə yetirilməsində öz töhfəsini vermişdir.

İnanıram ki, filial öz vizyon və missiyasına uyğun olaraq növbəti yubiley ərəfəsində milli və beynəlxalq bazar üçün rəqabətə davamlı, vətənpərvər ruhda tərbiyə edilmiş, yüksək ixtisaslı mütəxəssislər hazırlayacaq, ölkəmizin daim yüksələn xətlə inkişafına dəyərli töhfələr verəcəkdir.

Şübhə etmirik ki, filial yaxın gələcəkdə təhsilin keyfiyyətinin yüksəldilməsi, müsbət ənənələrin qorunub saxlanılması, cəmiyyətdəki nüfuzunun artması ilə müstəqil universitet statusu qazanıb, respublikanın və dünyanın elm, təhsil və mədəniyyət məbədi kimi fəaliyyət göstərəcəkdir.

**Keyfiyyətin təminatı şöbəsinin müdiri B/m. P.H.Rzayeva**



Azərbaycan Dövlət Pedagoji Univeristetinin Quba filialını 30 illik yubiley münasibətilə bütün həmkarlarımı təbrik edirəm. Azərbaycan təhsilinin inkişafı yolunda apardığı şərəflivə məsuliyyətliişlərində yeni-yeni uğurlar arzulayıram.

1991-ci ildə əsası qoyulan təhsil ocağı qısa müddət ərzində, məhsuldar və zəngin tarixi inkişaf yolu keçməklə ölkə təhsilinin inkişafına tövhə verə biləcək çoxlu sayda elmi-pedaqoji kadr yetişdirmişdir. Universitet regionda yerləşməsinəbaxmayaraq pedoqoji heyətin nüfuzlu elmi bazalara daxil olan jurnallarda dərc olunan məqalələri, hər il artan dokturant sayı, tələbələrin magistraturaya qəbul nəticələri, məzunların MİQ imtahanlarında yüksək göstəriciləri, filialda yeni ixtisasların açılması, maddi-texniki bazanın genişləndirilməsi, tədris prosessinə müasir texnologiyaların tətbiqi təhsilin inkişafına göstərdiyi səyin bariz nümunəsidir. Son illər universitet yerli univeristetlər ilə bərabər beynəlxaq reytinqli unversitetlərlə məqsədyönlü əlaqələr qurmağa, dünya təhsilinə və elminə inteqrasiyasına çalışır. İnanıram ki bundan sonrada şərəfli fəaliyyət ilə təhsili və elmi zənginləşdirməklə milli təhsilin inkişafına öz tövhəsinin verəcək. Azərbaycan Dövlət Pedaqoji Unveristetinin Quba filialının kollektivini təbrik edirəm! Yubileyimiz mübarək.

**İnformasiya və kommunikasiya texnologiyaları şöbəsinin müdiri B/m. Y.Q.Abayev**



30 illik yubiley regionda təhsilin inkişafında böyük bir iz qoyan təhsil müəssisəsi üçün qısa görünsə də əzəmətli yoldur. Universitet filial olmasına baxmayaraq, bir çox müstəqil universitetlərlə, hətta dünya miqyasında olan bəzi ali təhsil müəssisələri ilə müqayisədə irəli pillələrdədir. Filialımızın yubileyi münasibətilə bütün həmkarlarımızı, məzunlarımızı və tələbələrimizi təbrik edirəm. Təhsil yolunda universitet Şimal regionunda bir mayakdır.

**Gənc Alim və Tədqiqatçılar Şurasının sədri, B/m. E.H.Əhmədov**



Xüsusən, son bir neçə ildə təhsil sahəsində aparılan islahatların bariz nümunələrindən biri ADPU-nun Quba filialıdır. Cəmi 6 aydır ki, bu filialda fəaliyyətə başlamağıma baxmayaraq, hal-hazırda 4 yeni layihə üzərində çalışıram. Təbii ki, bu yenilikləri tətbiq etmək həm də inkişafyönümlü dəyişikliyə olan pozitiv yanaşmanın məhsuludur. Nəzərə alsaq ki, söhbət gələcəyimizi quracaq gənclərə təhsil verən bir ali təhsil müəssisəsindən gedir, məsələnin nə dərəcədə önəmli olduğunu anlamaq olar. Biz gənclərə bu cür iş mühitinin, tələbələrimizə keyfiyyətli təhsil şəraitinin yaradılmasında, bu qərarların verilməsində yaxından-uzaqdan əlaqəsi olan hər kəsə dərin təşəkkürlərimi bildirirəm.

Yubiley münasibətilə bütün kollektivimizi və tələbələrimizi təbrik edirəm. Növbəti 30 ildə dəfələrlə böyük nailiyyətlərə birlikdə addımlamağımızı arzulayıram.

**İnsan resursları şöbəsinin baş mütəxəssisi Ş.B.Laçınov**



Bu gün bizim hamımızı müqəddəs dəyərlərilə ülvi şəkildə birləşdirən Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialının 30 illik yubileyini qeyd etmək hər birimizdə böyük qürur hissi doğurur. Həm də ona görə qürur hissi keçirirəm ki, mən 30 ildir ki, burada müxtəlif vəzifələrdə çalışmışam, buna görə də bu 30 illik universitet mənə olduqca doğmadır. Bu möhtəşəm bayram münasibətilə bütün əməkdaşlarımızı, tələbələrimizi və sədası Vətənimizin müxtəlif guşələrindən, habelə dünyanın uzaq məkanlardan gələn bütün məzun olmuş həmkarlarımızı səmimi qəlbdən bir daha təbrik edir, növbəti yubiley tədbirlərində daha böyük uğurlar arzu edirəm. 30 yaşın mübarək, Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialı!

**Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının müəllimi S.K.Müzəffərova**



Direktor dosent Yusif Aliyevin təşəbbüsü ilə atılan addımların və hədəflərə uyğun inkişaf prioritetləri filial daxilindəki sturuktur yenilənməsini zəruri edib ki, bu da filialda bir sıra yeni ştatların yaradılmasına gətirib çıxarıb, həmçinin filialın məzunu, Vətən müharibəsi iştirakçısı İsmət Əhmədov işlə təmin olunub. Hər il kafedra müəllimlərinin elmi məqalələri, kitab, dərslik, proqram və monoqrafiyaları işıq üzü görür, nüfuzlu elmi nəşrlərdə çap edilən məqalələrin sayı da artan dinamika ilə inkişaf edir, hətta pandemiya dövrünün yaratdığı çətinliklərə baxmayaraq, filial əməkdaşlarının tədris ili ərzində istər elmi, istərsə də publisitik 100-dən artıq məqaləsi dərc olunmuşdur. Filialın elmi və pedaqoji kadr potensialında professorlar, elmlər və fəlsəfə doktorları, baş müəllimlər, alimlər, gənc doktorant və dissertantlar yer tutur. Bütün bu görülən işlər isə bizləri sevindirir.İnanırıq ki, nailiyyətlərimiz daha da çox olacaqdır.

**Təbiət fənləri və onun tədrisi metodikası kafedarsının baş müəllimi, f.r.f.d .N.Ə.Süleymanov**



Öz inkişaf tarixinə adi bir məktəb kimi fəaliyyətdən başlayan müasir ali təhsil müəssisələri olan universitetlər elmin, biliyin və cəmiyyətlərin inkişafı ilə həmahəng olaraq durmadan yenilənmiş və zamanla ayaqlaşmaq üçün bu gün də yeniliyin önündə getməyə davam edir. Həyatımızın bütün sahələrinə siyarət etmiş elmi-texnoloji tərəqqi bizlərdən son dərəcə qeyri-müəyyən görünən gələcəyə ciddi şəkildə hazır olmağımızı tələb edir. Qırx dörd gün davam edən Vətən müharibəsində ordumuzun dünyanı heyrətləndirən vətənpərvərliyi ilə yanaşı istifadə etdiyi ən müasir hərbi texnologiya ilə özünü məğlubedilməzliyinə inandırmış düşmən ordusunu darmadağın etməsi bu mühüm məsələnin ən bariz nümunəsidir. ADPU Quba filialı ölkə və dünya ali təhsil müəssisələri ilə müqayisədə kiçik görünsə də, atdığı inamlı addımlarla həm regionumuz, həm də ölkəmizdə diqqət mərkəzində olmağı bacarmışdır. Artıq beynəlxalq əlaqələr qurmaqda olan filialımız öz maddi-texniki bazasını, elmi potensialını günün tələblərinə uyğun olaraq yeniləmiş, uğurlu kadr siyasəti ilə tələbə və ictimaiyyətin rəğbətini qazanmışdır. Respublikamızda elm və təhsilin inkişafına öz töhfələrini verməkdə qətiyyətli olan filialımızın bu yolda daha inamla irəliləməsi direktorumuz dosent Yusif Alıyev və professor müəllim heyətimizin fədakarlığının nəticəsidir. Bir daha 30 illik yubileyimiz münasibətilə təbrik edirəm.

**Ədəbiyyat və dillər kafedrasının baş müəllimi**
**Qabaqcıl təhsil işçisi R.Ə. Sədullayev**



Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialı 30-cu ildönümü ərəfəsindədir. Ölkəmizin şimal bölgəsində ali təhsil pilləsinə çox yüksək səviyyədə və keyfiyyətli şəkildə töhfələr verən filialımız son illər ərzində daha da böyük inkişaf yoluna qədəm qoymuşdur. Əsas dəyərləri şəffaflıq, mükəmməllik, innovasiya, əməkdaşlıq olan Pedaqoji Universitet öz tələbələrinin gələcəyin savadlı müəllimi kimi yetişməsində müstəsna xidmətləri ilə seçilməkdədir. Filialımızın 30 illik yubileyi münasibətilə bütün həmkarlarımı və tələbələrimizi təbrik edir, şərəfli peşə fəaliyyətlərində müvəffəqiyyətlər arzu edirəm.

**Pedaqoji və ictimai fənlər kafedrasının müəllimi**
**p.f.d. L.A.Kərimova**



Fəaliyyət göstərdiyi müddət ərzində elmi-pedaqoji kadr hazırlanması işini uğurla həyata keçirmiş filialın hazırda da müasir tədqiqatlara əsaslanaraq və innovativ təlim-tədris texnologiyalarından istifadə edərək yüksək mənəviyyata, vətəndaşlıq hislərinə malik Azərbaycan müəllimləri yetişdirir. Həyata keçirilən təhsil prosesində, vətənpərvər və savadlı gəncliyin tərbiyəsində müstəsna rolu olan ADPU-nun Quba filialının əməkdaşlarının da təbii ki özünəməxsus yeri var. Son 3 ildə filialın əməkdaşlarının bir çox tədbirlərdə və layihələrdə iştirak etmələri özü də filialın fəaliyyət dairəsinin daha da genişləndirilməsinin göstəricisidir. Qeyd etmək yerinə düşər ki, ADPU Quba filialında verilən təhsil nəinki regionun eyni zamanda respublikamızın gələcək təhsilinin daha geniş inkişafına yönələn starteji iş prosesidir.

ADPU Quba filialının yetirməsi olaraq fəxr edirəm. ADPU Quba filialının təhsil işinin bundan sonra da davamlı və daha innovativ təlim üsullarına əsaslanmasını diləyirəm. Filialımızın 30 illik fəaliyyət dövrünü yüksək qiymətləndirir və uğurlar arzu edirəm.

**Pedaqoji və ictimai fənlər kafedrasının müəllimi**
**V.H.Kərimova**

# AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QUBA FİLİALI 30 İLLİK TARİXİN GÜZGÜSÜNDƏ

## ADPU QUBA – 30 ŞƏKİLLƏRDƏ



ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, Filologiya fakültəsinin dekan əvəzi, tanınmış şairə professor Mahirə Hüseynova (Nağıqızı) Quba filialında



ADPU-nun rektoru professor Cəfər Cəfərovun "Alma Bayramı" münasibətilə Quba rayonunda olarkən filialın müəllim və tələbə kollektivi ilə görüşü



Quba RİH Başçısı Ziyəddin Əliyev "9 Noyabr Dövlət Bayrağı Günü" münasibətilə ADPU-nun Quba filialında tədbirdə çıxış edir




Almaniyanın Nürnberq şəhərində fəaliyyət göstərən "Türk tarixi və mədəniyyətləri muzeyi"nin direktoru Cəmaləddin Özdəmirlə görüşdən



Respublikanın tanınmış alim və professorları filialda dərs prosesindən sonra xatirə şəkli çəkdirirlər



ADPU-nun Quba filialının kollektivi

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ
# QUBA FİLİALI - 30




## TƏLƏBƏ HƏYATI

**Filialda tələbələrin şəxsiyyət kimi inkişafı hər zaman diqqət mərkəzindədir**

Sevindirici haldır ki, ADPU-nun yaradılmasının 100 illiyi və Filialın yaradılmasının 30-cu ildönümünü torpaqlarımızın azadlığı, ərazi bütövlüyümüzün təmin olunması şəraitində, zəfər ovqatı ilə qeyd edirik, ən böyük qürurumuz isə məzun və tələbələrimizin də bu qələbədə payının olmasıdır. Vətən Müharibəsində əldə etdiyimiz tarixi zəfər Azərbaycan müəllimi üçün ilham qaynağıdır ki, bu da Azərbaycan elminə, təhsilinə, ölkəmizin hərtərəfli inkişafına töhfələrimizi verməkdə bizlərə yol göstərir. Bu yolda yorulmadan, əzmlə çalışır, filial kollektivi olaraq Azərbaycanın gələcəyi üçün ixtisaslı kadrlar – müəllimlər hazırlayırıq.Təsadüfi deyildir ki, hazırda Filialın inkişaf dinamikası,



qarşıya qoyduğu hədəflər, əldə edilən uğurlar, yeni sturukturun formalaşdırılmasını zəruri edən səbəblər filialın önündə duran qısamüddətli hədəflərə çatmağa, orta və uzunmüddətli hədəflərə doğru irəliləməyə təkan verir. Bu səbəbdən də təkcə aidiyyəti strukturların deyil, bütün kollektivin səyi nəticəsində müxtəlif beynəlxalq və yerli tədbirlərə, layihələrə, ilklərə imza atılır, tədrisin və tədbirlərin keyfiyyət və kəmiyyəti artırılır. Son illər Filialda əmək bazarının tələbləri nəzərə alınaraq təhsilin bakalavriat səviyyəsində bir sıra yeni ixtisaslar açılmış,2021/2022-ci tədris ilində bu say 10-a qaldırılmışdır. Bakalavriat səviyyəsində verilən yüksək təhsilin, elmi tədqiqat fəaliyyətinə yaradılan şəraitin nəticəsidir ki, 100-ə yaxın professor-müəllim heyətinin təhsil verdiyi ali təhsil ocağında tədris prosesinin daha səmərəli və innovativ üsullarla təşkili məqsədilə müəllimlərin peşəkarlıq səviyyəsinin artırılması istiqamətində addımlar atılır, müntəzəm olaraq təlim və seminarlar təşkil edilir. Bundan əlavə əməkdaşların maddi rifah halı daim yaxşılaşma istiqamətində dəyişir.

**Qələbədə Azərbaycan müəlliminin də payı var**

Ölkəmizdə pedaqoji kadr hazırlığı, regionların təhsilinin inkişafı məqsədi ilə hər zaman diqqət mərkəzində olan Şimal bögəsinin yeganə ali təhsil müəssisəsi Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının yaradılmasından 30 il ötür.



Təsadüfi deyildir ki, bu 44 günlük möhtəşəm qələbədə bizim 3 tələbəmiz və 27 məzunumuz da iştirak etdi, öz adlarını tarixə yazdırmağı bacardılar: Beydullayev Vurğun Əlzaman, Seyfəddinov Elvin Elsevər, Əzimov Əmrah Ağamirzə, Mərdanov Ruslan Yavər, Mərdanov Səfa Hafiz, Mehdiyev Seyidşah İlham , Ağamalıyev Xəyal Niyaməddin, Əkbərov Rəşad Şahin, Cavadlı Gəray Xanlar, Yusifzadə Yusif Cavanşir, Əlibalayev




Məmmədbağır Əlibala, Ramazanov Həzrət Şahin, Xəlilzadə Xeybər Şahin, Qasımov Ramiq Zahid, Əhmədov İsmət Kamal, Abdullayev Həsən Mustafa , Cahangirov Məmmədağa Yusif , Tahirov Ayaz Nizaməddin , Qəhrəmanlı Rauf Özübəy, Muradov İbrahim Rəhman, İsmayılov Müfiq Elçin, Baxşəliyev Nadir Elçin, Oruczadə Tural Nazim, Şəfayətli Nurlan Rəhman, Məcidov Ramiz Zeynal, Musayev İlkin Tahir, Sadıqzadə Savalan Namət. Ölkəmizdə yeniliklərin tətbiqi, sürətli internet imkanlarının həyatımızın hər sahəsi olduğu kimi, təhsil sahəsinə də vacib mövqe tutması bizlərin, yəni təhsil sahəsində çalışan kadrların qarşısına yeni məqsədlər qoydu, belə ki, təhsil və elm sahəsində mükəmməl uğurların əldə edilməsi üçün rəqabətədavamlı, tədqiqat meylli, mobil təhsil mühiti formalaşdırır, bizləri bu mühitdə yeni ideyalar ətrafında birləşməyə sövq edir. Ölkə Prezidenti cənab İlham Əliyevin təhsil sahəsinə göstərdiyi diqqət və qayğı sayəsində də bir daha şahid oluruq ki, Azərbaycanda insan kapitalının formalaşmasında keyfiyyətli təhsil və təlim sistemi ön sırada dayanmağı bacarır. Ön sırada olmaq üçün Filialda görülən işlər Azərbaycan Respublikası Prezidentinin müvafiq Sərəncamlarından, Təhsil Nazirliyinin, ADPU-nun rektoru professor Cəfər Cəfərovun, filialın direktoru dosent Yusif Alıyevin müvafiq qərarlarından irəli gələn təşəbbüs və tapşırıqlar əsasında sistemli şəkildə həyata keçirilir.

Sevindirici haldır ki, filialda həyata keçirilən layihələr, tədbirlər, beynəlxalq konfranslar (ADPU-nun Quba filialında Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100, Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialının 30 illik yubileyinə həsr olunmuş "Regionlarda ali təhsil: reallıqlar və perpektivlər", Beynəlxalq Elm Mərkəzinin, Akademik Həsən Əliyev adına Coğrafiya İnstitutunun, Azərbaycan Respublikası Silahlı Qüvvələrinin Hərbi Akademiyasının və Naxçıvan Müəllimlər İnstitutunun təşkilatçılığı ilə İsveçin Gothenburg Universiteti ilə birlikdə "Qarabağ: Zəfərə Gedən Yol" adlı XVII Beynəlxalq elmi konfrans və s.) bir daha onu göstərdi ki, son illər filialın ölkədaxili münasibətləri kimi, beynəlxalq əlaqələri də inkişaf etməkdədir. Təkcə elə filial daxilində 2020/2021-ci tədris ilində Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialında çağdaş Azərbaycan poeziyasının sevilən şairəsi, ziyalı alim, ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, Filologiya fakültəsinin dekanı, professor Mahirə xanım Nağıqızı ilə "Özümü biləndən qədrini bildim..." adlı möhtəşəm görüşün, respublikanın tanınmış alim, pedaqoq və ziyalıları ilə görüşlərin, Vətən müharibəsi qəhrəmanları ilə, Şəhid ailələri ilə görüşlərin keçirilməsi, filialın TEC-nin təşkilatçılığı ilə Elmi konfransların keçirilməsi və bu konfranslarda respublikanın qabaqcıl universitetləri əməkdaşlarının məruzələrinin yer alması, məzunlarımız sırasında butədris ilində ali məktəblərin magistratura səviyyəsinə qəbulun 23-nəfərə çatması, filial əməkdaşlarının müəllifi olduğu kitab və dərsliklərin sayının artması, fəlsəfə doktoru elmi dərəcəsi alan doktorantlarımızın olması və bu kimi işlər Filialı ölkənin elm və təhsil məkanına inteqrasiyasını, müstəqil olmaq yolunda atılan addımlarını daha da sürətləndirir. Bundan əlavə Filial beynəlxalq və ölkədaxili əlaqələrlə yanaşı, ümumrayon əməkdaşlığına da xüsusi önəm verir, filialın rəhbərliyinin təşəbbüsü ilə Quba rayonunda yerləşən müxtəlif dövlət qurumları ilə əlaqələr yaradılır, bilavasitə elmi tədiqat fəaliyyətininin səmərəli təşkilinə, gənclərin asudə vaxtının düzgün qurulmasına, onların şəxsiyyət kimi hərtərəfli inkişafına, eləcə də rayonda məzunların işlə təmin olunmasına yönəldilir. Yəni filialda görülən işlərlə əlaqədar qarşıya qoyulan məqsədlər nəinki region, eləcə də respublika, hətta beynəlxalq miqyaslı tədbirlərlə əhatələnir. Filialda həmçinin tələbələrin yüksək səviyyədə təhsil almaları, elmi-tədqiqat işlərinə cəlb olunmaları, eyni zamanda, asudə vaxtlarının səmərəli təşkili üçün 100-lərlə layihələr, intellektual oyunlar, müsabiqələr, təlim və seminarlar, olimpiadalar, təcrübə proqramları, həyata keçirilir, tələbələr müxtəlif platformalarda universitetin idarəçilliyinə cəlb olunur, çempionatlarda, yarışlarda birincilik əldə edir, qələbə qazanır, könüllü kimi fəaliyyət sagöstərirlər. Təbii ki, bütün bu qeyd etdiklərimiz filialda görülən işlərin bir qismidir.Filialımızda tədrisin müasir, innovativ təlim texnologiyaları əsasında qurulması, təcrübə və innovasiyaların birliyinin hiss edilməsi, tədris və təlimin keyfiyyətinin dövrün tələblərinə uyğun şəkildə yenilənməsi, həmçinin region ali təhsil müəssisəsinin xarici dövlətlərin qabaqcıl universitetləri ilə beynəlxalq əlaqələrinin və respublika universitetləri ilə ölkədaxili əməkdaşlığının inkişaf etdirilməsi onun tarixi ənənələrin və modern dünya təcrübəsinin vəhdəti şəklində idarəedilməsindən, yeniliklərə açıq olan kadr balansından irəli gəlir. Buna görə də inanırıq ki, filial bundan sonra da daha böyük uğurlara imza atacaqdır. Çünki ən əsası filialın professor-müəllim heyəti, tələbələri, məzunları, əməkdaşları bu ali təhsil ocağı ilə, onun tarixi və bu günü ilə fəxr edir, qürur duyur.

## MİNNƏTDARLIQ

Yubiley buraxılışının hazırlanmasında göstərdikləri dəstəyə görə filialın direktor köməkçisi **Mürvət Əliyev** və Keyfiyyətin təminatı şöbəsinin müdiri **Pərvanə Rzayevaya** xüsusi minnətdarlığımızı bildiririk.



Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 1199

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.